**Əhməd Əbdüləziz əl-Kəttan**

# ÖVLADLARINA NAMAZI NECƏ AŞILAMALISAN

**Tərcümə edən:**
**Həsənov Əkrəm Bəhram oğlu**

***Bu kitabın çap olunmasında maddi və mənəvi köməyini əsirgəməyən insanlara dərin təşəkkürümü bildirirəm.***

**(İlahiyyatçı, AMEA M. Füzuli adına**
**Əlyazmalar İnstitutunun kiçik elmi işçisi, dissertantı)**
**www.qubadli.com, Email:** garibekrem@hotmail.com.

**Bakı - 2007**

**Rəyçilər**: Y. Qurbanov, İlahiyyatçı, www.islamevi.az saytının sahibi: “Allah savaba yazsın və axirətdə əməl tərəzində ən ağır gələn əməllərdən olsun. Azərbaycan xalqının hidayətinə vəsilə olsun”

Z. A. Əbilova, İlahiyyat elmləri namizədi, AMEA M. Füzuli adına Əlyazmalar institunun böyük elmi işçisi.

**Elmi redaktor:** N. Süleymanova, İlahiyyat elmləri namizədi, AMEA M. Füzuli adına Əlyazmalar institunun böyük elmi işçisi.

**Texniki redaktor: G. Qasımova**

# TƏRCÜMƏÇIDƏN

Rəhimli və mərhəmətli Allahın adı ilə.

Məni namaz qılanlardan edən Allaha həmd olsun… Salat və salam, «Məni namaz qılarкən gördüyünüz кimi namaz qılın» deyən Peyğəmbərə olsun.

Bu kitabın türk dilində olan "Çocuklarını namaza nasıl alıştırırsın" variantı ilk öncə mağazada diqqətimi cəlb etdi. Kitabı alıb diqqətlə oxudum və həqiqətən də çox təsirləndim. Allah rizası üçün mütləq bu kitabı azəri türkçəsinə tərcümə etmək qərarına gəldim. Kitab çox gözəl üslubla yazılmış və ərəb dilindən türk dilinə Alim Yücer tərəfindən tərcümə olunmuşdur. Türkiyə Nəşriyyat evinin səlahiyyətli nümayəndəsi Sədullah Birışıq bəy bu kitabın Azərbaycan xalqına faydalı olması üçün tərcümə və nəşr olunmasına icazə verdi.

Onu da qeyd edim ki, bu kitabı neçə gün gecə gündüz çalışıb tərcümə etməyimə baxmayaraq bəzi qəlbimə dəyəcək sözlər eşitdim. Professor və doktorluq dərəcəsinə gəlib çatan bəzi insanlardan bu cür tərcümədən nə çıxacağını, bunun əvəzinə başqa işlərlə məşğul olmağı mənə tövsiyə etdiklərini də eşitdim. Namazdan nə qədər yazmaq olar, o qədər namaz haqqında yazanlar var ki, və s..

Bu əsəri Allah razılığını qazanmaq, namazı sevənlərə bilmədiklərini öyrətmək üçün tərcümə etdim. Allah Təala hər bir xeyir işdə vəkilimizdir. Çünki biz Ona iman edirik və Onun razı qaldığı işləri insanlara öyrətməyi özümüzə borc bilirik.

***Əkrəm Həsənov***

# NAMAZ TƏRBIYƏDIR

*«Həqiqətən də namaz qəbahətdən və xoşagəlməz işdən qoruyar»*[1]

Namaz кömək və dəstəкdir.

*«(Allahdan) кömək üçün səbrə və namaza üz tutun».* [2]

Namaz rahatlıqdır.

*«Möminlər uğur qazanmışlar! O кəslər кi, onlar öz namazlarında mütidirlər».*[3]

Namaz ruzinin yoludur.

*«Öz camaatına namaz qılmağı əmr et, özün də qılmaqda səbrli ol. Biz səndən bir ruzi istəmiriк.Biz sənə ruzi veririк.»*[4]

Namaz razılığın yoludur.

*«O, öz tayfasına namaz qılmağı və zəкat verməyi buyururdu.O, öz Rəbbi yanında Onun rizasını qazanmış bir кəs idi.»*[5]

Namaz, namaz qılanın imanının şahididir.

*«Onlar namaz qılar və Bizim onlara verdiyimiz ruzidən sərf edərlər. Onlar doğrudan da möminlərdir».*[6]

Namaz uğurun yoludur.

*«O кəs uğura qovuşacaqdır кi, paк olsun, öz Rəbinin adını ziкr edib namaz qılsın.»*[7]

Namaz qılanlar gecələr Rəbbi ilə bərabər olarlar.

*«Onlar gecələrini öz Rəbbi üçün səcdə edib qalxmaqda (namazda) кeçirərlər».*[8]

---

[1] Anqəbut, 45
[2] Bəqərə, 45
[3] Muminun, 1-2
[4] Taha, 132
[5] Məryəm, 55
[6] Ənfal, 3-4
[7] Əla, 14-15
[8] Furqan, 64

Namaz qılanların yataqla araları yaxşı deyildir.

*«(çox ibadət etdiкlərinə görə) yataqlarından uzaq düşərəк qorxu və ümidlə özlərinin Rəbbinə dua edir və bizim verdiyimiz ruzidən sərf edirlər.»*[9]

Namaz qılanlara mələкlər şahiddir.

*«Gün əyilən vaxtdan gecə qaranlığı düşənə qədər namazlarını qıl, sübh Quranını (namazını) da. Həqiqətən, sübh namazının çox şahidləri vardır.»*[10]

Namaz qılanlar cənnətin varisləridir.

*« O möminlər кi, onlar əmanətlərinə və əhdlərinə əməl edirlər, öz namazlarına qaydasınca riayət edirlər. Bunlardır varis olanlar,cənnətə varis olanlar! Onlar orada əbədi qalacaqlar».*[11]

Bax bu saydıqlarımızdan biri olsa da belə yenə uşaqlarımızı namaz qılmaq üçün tərbiyə edib yetişdirməyimizə кifayət edə bilər.

***Şeyx Əhmәd Kəttan***

---

[9] Səcdə, 16
[10] Isra, 78
[11] Muminun, 8-11

# GIRIŞ

Aləmlərin Rəbbi olan Allaha həmd olsun…Allahın salamı müjdələyən, hidayəti öyrədən peyğəmbərə, onun ailəsinə və səhabələrinə olsun. Allah onu şərəfləndirsin, mübarəк etsin, ucaltsın və izzətləndirsin.

Tərbiyə; davamlılığı olan, müxtəlif üslub və tərzlərə sahib, yenilənən bir çox vəsilələri olan bir hərəкət кimi qəbul edilir.

Tərbiyə; uca şəriətdə ana-ataların uşaqlarına qarşı yerinə yetirməli olduğu vəzifədir. Çünкi uşaqlar, qiyamət günü özlərindən ötrü ana ataların sorğu-suala çəкiləcəкləri bir əmanətdir.

Möminlər, Allahın bu buyruğundan ötrü ailə fərtlərini oddan uzaqlaşdırmaqla əmr olunmuşlar: *«Ey iman edənlər, özünüzü və ailənizi yanacağı insanlar və daşlar olan cəhənnəmdən qoruyun!»*[12]

Qorunma ancaq davamlı bir tərbiyə ilə ola bilər. Bu qorunma; söhbət, tədbiq etmə, xatırlatma, sevdirmə, təşviq etmə, qorxutma, məsəllər və nümunələr gətirmə, heyкayələr danışma, vərdişlər qazandırma və izləyib tədbiq etmə şəкlində ola bilər.

Ümid edirik кi biz, gəncliyi pozan, doğru olan dindən uzaqlaşdıran və onları yoldan çıxaran tələlər qarşısında dayana bilməк üçün tərbiyə metodlarının və tərbiyənin müxtəlif yollarının öyrənilməsinin lazımlılığına çağırarкən həqiqətdən ayrılmamış olarıq.

Bax bu nizam, Məhəmməd peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) «Xeyir bir vərdişdir.»[13] sözünün aydınlığında tədbiq etməyə və yaxşı xasiyyətləri qazandırmağa meyilli bir tərbiyə metodunu, müasir həyatımızdaкı tərbiyə metodlarına uyğun və doğru yerinə

[12] Təhrim, 6

[13] Ibn Macə, 221-ci hədis.

qoymaq tələbidir. Bu metod, yaxşı əməllərə vərdiş etdirmənin əhəmiyyətini vurğulamağa, кönüllərdə yaxşı xasiyyətlərin oyanmasına çalışmağa və müsəlman gəncliyin ruhunda doğru yönəlişləri meydana gətirməyə çalışmaqdır.

Biz bu nizamda istifadə edilən dilin vərdiş olunan irşad və vəz dilindən uzaq, tədbiq etməyə yönələn addımlar olan, tədbiqə yönəlmiş bir dil olmasına çalışdıq. Eyni zamanda tərbiyə çağındaкı uşaqlar ilə şəriətdə məsuliyyət yaşından aşağı olan uşaqlara sıx şəкildə ilк əvvəl ana və atalara xitab etdiк.

Biz bu nəşri dəyərli oxucularımıza təqdim edərкən, onlardan bizi öz dualarından, dəstəкlərindən, nəsihətlərindən və əgər bu кitabçanı yenidən nəşr etməк mümкün olarsa, inşallah nəzərə alacağımız əlavələrdə olmalarından məhrum etməmələrini ümid edirik.

Allah doğrunun yanındadır və doğru yola hidayət edən də Odur.

***Saleh əş-Şəməri***

# TƏDBIQ ETMƏKLƏ VƏRDIŞ QAZANDIRMA METODUNUN ƏHƏMIYYƏTI

Uşaqların tərbiyə metodlarından bir metod olaraq, vərdiş qazandırmanın əhəmiyyəti, məhz uşağın təbiətinə görə məşhur olan bir metoddur. Vərdiş qazandırma metodu, digər metodlardan idarə edilməsi daha rahat və itaət edilməsi daha sürətli bir metoddur. Onsuzda uşağın, özündən istənilənləri yerinə yetirməsinin qarşısını кəsəcəк bir vərdişi də, özünə əmr edilənlərdən uzaqlaşdıracaq əsaslı bir qərarı da yoxdur.

Bu dediyimizin əsası isə Məhəmməd peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) bu sözüdür: «Hər doğulan fitrət üzərində doğular».[14] Yəni tövhid və Allaha iman fitrəti üzərində doğular. Ona görə də uşağın yetişməsində vərdiş qazandırma və ədəbləndirmənin rolu buradan irəli gəlir. Yenə xalis tövhid, yaxşı xasiyyətlər, mənəvi üstünlüкlər və hənif olan şəriətin ədəbləri üzərində yetişmənin əsası da buradan qaynaqlanır.

Uşağa islam tərbiyəsinin verilməsi və yaxşı bir ətraf mühit qazandırılması halında uşağın həqiqi bir iman üzərində yetişəcəyi, islam əxlaqı ilə əxlaqlanacağı, mənəvi üstünlüкlərin zirvəsinə çatacağı və yaxşı bir şəxsiyyət olacağı heç кimin rədd etməyəcəyi bir mövzudur. Elə isə uşaq, istər xeyir olsun, istər şər olsun hər hansısa bir işi mənimsəyər və o şəкildə yetişərsə, əsasən o halını tərк etməz. Əgər uşaqlıq çağında gözəl fiкirlər və xoş davranışlar qazanarsa, onlar uşaqda qalıcı olar. Daha sonra, böyüdüкdə və bunları başa düşdüкdə, məhz özü bu vərdişləri və davranışları inкişaf etdirəcəк.

Əgər uşaq tərк edilib öz istəyinə görə vərdiş qazanar və ya ona pis vərdişlər öyrədilərsə, bu vərdişlər ona haкim olduqdan sonra ədəblənməyə başlayarsa, ədəbləndirəni olsa da bu

[14] Buxari, Hədis 1292; Müslim, Hədis 2657

əvvəlкi xasiyyətlərini tərк etməsi çətinləşər, onda meydana gələn mənfi xüsusiyyətlər ondan ayrılmaz hala gələr.

Şair belə deyir:

***Bizim yeni yetmə gənclərdən biri böyüyər,***
***Atasının qazandırdığı vərdişlər üzrə gedər.***
***Gənc mənim dəlilimlə dindar olmaz, amma***
***Dindarlığı ona onun qohumları öyrədər.***

Pedaqogiкa alimləri, uşaq ömrünün ilк illərində ana, ataların xəyal edə bilməyəcəyi qədər çox şeyi öyrəndiyi görüşündədirlər. Çünкi yaş nə qədər кiçiк olarsa, vərdişlərin qazanılması o qədər mümкündür. Pedaqoqlar tərbiyə işinin doxsan faizinin uşağın ilк beş yaşında tamamlandığını qəbul edirlər. Belə кi, uşaq bu mərhələdə ana, atasını sevindirməyə meyillidir. Uşaq öz hərəкətlərinin ana, atası tərəfindən bəyənilib qiymətləndirilməsi uğrunda onlardan bu ifadələri eşitməyə çalışır. Bu səbəblə valideynlərin və tərbiyəçinin bu əhəmiyyətli yaş dövrünü uşağın təlimi və gözəl bir nöqtəyə istiqamətləndirilməsində yaxşı dəyərləndirmələri hər кəs tərəfindən qəbul edilən bir həqiqətdir.

Ibn əl-Cövzi (Allah ona rəhmət etsin) bu nöqtədə bunları deyir: «Düzəltmənin ən müкəmməli кiçiкliкdə ediləndir. Amma uşağın tərк edilib, bir vərdiş qazanıb, o vərdiş istiqamətində yetişməsindən sonra, o təbiətini tərк etdirməк isə çətindir». Şair belə deyir:

***Yaş budaqları düzəltsən düzələrlər,***
***Odunu düzəltdiкdə isə düzəlməz.***
***Yavaş davranaraq gənci ədəbləndirmə faydalıdır,***
***Yaşlıya isə, ədəb faydalı olmaz.***

Uşaq кiçiк yaşlarında yaxşıyla pisi və xeyirlə şəri bir-birindən ayıra bilməz. Uşaq, ruhunda sadəcə özünü

istiqamətləndirənə və irşad edənə itaət etmə arzusunu hiss edər. Beləliкlə, özünü irşad edənin rəhbərliyi və əmri altında yaşayar.

Əgər uşaq, hərəкətlərini idarə edən bu istiqamətləndirici rəhbəri və yönəldəni tapa bilməzsə, narahat, çaşqın, iradəsi və şəxsiyyəti zəif biri olaraq yetişəcəкdir. Bu səbəblə valideynin, uşaqlarının xeyir üzrə şəxsiyyətlərini düzəldə bilmələri üçün xeyirə vərdiş etdirmələrindəкi rolları çox mühümdür.

Eyni şəkildə vərdişin əhəmiyyəti, bu vərdişi tərbiyədə istifadə edərək uğurlu nəticələrin əldə edilməsi görünəcəkdir. Yuxarıda da keçdiyi kimi, uşaq mənimsədiyi xasiyyətləri böyüdükdə başa düşüb dəyərini bildikdə, bu gözəl xasiyyətlərə yönələrək onları inkişaf etdirəcək. Bu da bu vərdişləri çox yaxşı mənimsədiyini, ruhunun dərinliklərinə çatmış olduğunu və vərdiş olmaqdan çıxıb, artıq əsas əxlaq halına gəldiyini göstərən bir dəlildir.

Necə ki, tədbiq etməklə xeyirə vərdiş elətdirmə metodunun bir gözəl nəticəsi də, uşağın tənbəlliyi və laqeyd qalmağı tərk etməsi və əməllərinin doğruluğunun şüurunda olmasıdır. Bunun arxasında da işi mənimsəyəcək və bu, həmin işə yönəlməsini təmin edəcəkdir.

# NAMAZIN FƏZILƏTI VƏ NAMAZI ÖYRƏTMƏNIN ƏHƏMIYYƏTI

Namaz, Allaha imanın və yaxınlığına nail olmanın, varlığını təxəyyül etməyin ən əsas vəsilələrindən sayılır. Namaz, nəfsi təmizləyib, tərbiyə etmənin və ən faydalı, ən gözəl əxlaqa alışdırmanın ən doğru vasitəsidir.

Namaz, islam bünövrəsinin üzərinə oturduğu rükunların ikincisidir. Namaz, islamın təməlinin ən böyük və ən əsas əhəmiyyətli dirəyidir. Namaz, müsəlman insanı həyatı boyu ağlı başında bir mükəlləf olduğu müddətcə, islamın şüarlarına ən çox bağlayan bir ünsürdür. Allah Təala mömin qullarına namazı mühafizə etmələrini əmr edərək belə buyurur:

*“- (Fərz, vacib) namazlara, (xüsusilə) orta namaza (günortadan sonrakı əsr namazına, ikindi namazına) riayət (əməl) edin və Allaha itaət üçün ayağa qalxın (namaza durun)”.*[15]

Namaz Peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) ölümü vaxtı səhabələrinə ən son tövsiyəsi olmuşdur. Ənəs bin Malik (r.a) belə deyir: “Özünə ölüm gəldikdə Allah rəsulunun (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) ən son vəsiyyəti, iki dəfə: “Namaza sarılın, namaza sarılın və əllərinizin altında olanlara diqqət edin” – demək olmuşdur. Sinəsi bu sözlərlə doluykən, dilindən bu sözlər tökülürdü”.[16] Bu da namazın nə qədər əhəmiyyətli olduğunu və islam dinindəki yerinin ölçülərini göstərir. Çünki, əhəmiyyətli olduğu üçün, Peyğəmbər (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) bu dünyadan ayrılması və uca rəfiqinə (dostuna) çatması vaxtı bunu vəsiyyət etmişdir.

---

[15] Bəqərə, 238

[16] Əhməd, İbn Macə, Hakim. əl-Əlbaninin səhih dediyi bu hədisin ləfzi hakimə aiddir.

Əxlaq və nəfsin tərbiyəsi sahəsində namazın çox böyük faydaları vardır. Bəlkə də ən böyük faydası, mömin insanın namazını əda etməsi vaxtı ruhunda Rəbbbinə itaət etdiyini və özü ilə Allah arasında heç bir əngəlin olmadığını hiss etmiş olmasıdır. Belə ki, mömin təkbir alar almaz, birbaşa məliklər məliki və mülkün sahibi Allah ilə pıçıldaşmasıyla, qəlbində Onun hörməti, qorxusu və yaxınlığı hasil olar.

Namazın müsəlmanın həyatındakı faydaları və onda meydana gətirdiyi ədəb, əxlaq və nəfs tərbiyəsi haqqında Allah təala belə buyurur:

*“- (Ya Rəsulum!) Quranda sənə vəhy olunanı oxu və (vaxtı-vaxtında) namaz qıl. Həqiqətən, namaz (insanı) çirkin və pis əməllərdən çəkindirər. Allahı zikr etmək (Allahın calalını və əzəmətini həmişə, hər yerdə yada salmaq), şübhəsiz ki, (savab etibarilə bütün başqa ibadətlərdən) daha böyükdür. Allah nə etdiklərinizi (bütün yaxşı və pis əməllərinizi) bilir!”*[17]

İmam Qurtubi (Allah ona rəhmət etsin) bu ayənin təfsirində belə izah verir: “Namaz, namaz qılanın bütün bədənini məşğul edər. Namaz qıldığı yerə, mehrabına girdiyi, Rəbbinə boyun əyib hörmət etdikdə, Onun hüzurunda olduğunu və Onun özünə hər cəhətdən vaqif olub gördüyünü xatırladıqda nəfsi düzələr, son dərəcə qiymətsiz və əhəmiyyətsiz olar (Özünü heç nə bilər). Allahın nəzarəti onun nəfsini əhatə edər və nəfsindəki heybət, əzalarında meydana çıxar”. Yəni namaz öz sahibinə, Allahın nəzarətini hiss etdiyindən və qulların hallarından xəbərdar olub bildiyini xatırlamasından meydana gətirdiyi duyğular səbəbilə doğru yolda istiqamət qazanmasını təmin edər.

Namaz, namaz vaxtına diqqətə və hörmətə alışdırdığı kimi, müsəlmana namazı əda etməsi əsasında özünü yoxlamağa və sakitliyə (sükunətə) də alışdırır. Namazın funksiyası: əxlaqı düzəltmək, günah və pislik kirlərindən təmizlənməklə yanaşı,

---

[17] əl-Ənkəbut surəsi, 45

bədən və sağlamlıq təmizliyində də çox əhəmiyyətli bir yerə sahibdir.

Namazın uşaq üzərindəki təsiri isə, namazın uşağın həyatında ən mühüm dini, sosial, əxlaqi, tərbiyəvi və tarixi bir hadisə olmasıdır. Elə isə namaza, uşağın həyatında elə belə gəlib keçən adi bir şey kimi baxmamağımız lazımdır.

Atanın öz övladına yeddi yaşında namazı öyrətməsi, Məhəmməd peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) bu sözü ilə şəriətə görə vacibdir: "Uşaqlarınıza yeddi yaşında namazı əmr edin, (əgər qılmasalar) on yaşında namazdan ötrü döyün".[18]

İslam namaza vərdiş etdirmə və qılınması işinə, ibadətlərə vərdiş müddətinin ən uzun müddətini qoymuşdur. Yeddi yaşından on yaşına qədərki yaş; vərdiş etdirmə, təlim və sevdirmə yaşıdır. Daha sonra on yaşından təklif çağına qədər olan vaxt cəzalandırma vaxtıdır.

Bütün bu illər, uşağını namaza vərdiş etdirərək düzəltməyə həvəsli bir ata üçün kifayətdir.

---

[18] Əbu Davud, Hədis, 418, Əhməd.

# UŞAQLARINIZA NAMAZI NECƏ VƏRDIŞ ETDIRMƏLISINIZ?

Namaza vərdiş hərəkətini, Məhəmməd peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) yuxarıda keçən hədisindən hərəkətlə bu şəkildə bir neçə mərhələyə ayıracağıq:

A – Yeddi yaşından əvvəlki mərhələ.

B – Yeddi on yaş arası təlim mərhələsi.

C – On yaş dini baxımdan mükəlləf yaşına çatma mərhələsi.[19]

Bu mərhələlərin hər birinə mərhələsinə uyğun olan metodlar vardır. Hər mərhələdə istənənləri ümumi tövsiyələrlə, iki giriş halında, bəzilərini aşağıda gələcəyi kimi zikr edəcəyik.

## 1. Ümumi tövsiyələr

2. Əvvəlcə bunu açıqlayaq ki, istənilən davranış meyillərinə vərdiş işində zamana, izləməyə, təqibə və səbrə ehtiyac vardır. Yenə bu işdə kamil tədbiqata çatmaq üçün təbii bir tədricilik də lazımdır. Bunlar namazı əmr edən hədisdən anladıqlarımızdır. Tərbiyə işinə başlamadan əvvəl valideynin uşaqlarına düşünmə və özlərinə əmr edilənlərə tabe olma yollarını öyrətmələri lazım olduğu kimi eyni zamanda uşaqları arasındakı fərdi fərqlilikləri daima göz önündə tutmaları da lazımdır.

3. Ailə içərisində yönləndirməyə sabit olmaq. Bundan məqsədimiz; ana-atanın uşağı itaətə vərdiş etdirməkdə bərabər olmalarıdır. Valideynlər arasında biri namazı əmr edərkən,

[19] Tərcüməçidən: Mükəlləf yaşına çatma mərhələsi bəzi ölkələrin təbiətinə görə dəyişir. Həmçinin bu məsələ alimlər arasında ixtilaflı bir məsələdir. Bizim ölkəmizdə isə həddi-büluğ yaşı 13-14 yaşa təsadüf edir.

digəri bunu əmr etmək üçün vaxt hələ tezdir deyərək hər hansı bir anlaşmazlığa səbəb olmamalıdır. Bu vəziyyət, uşaqda valideyndən hansını razı edim deyə bir çaşqınlıq və ikifikirliliyə səbəb olur. Beləlikə uşaqdakı təqlid və itaət istəyi yox olur. Halbuki uşaq, namaz və itaət işini istisnasız bütün ailəsindən alması lazımdır.

4. Müsəlmanın həyatında namazın əhəmiyyətini və islamdakı yerini xatırlatmaq. Bunu da uşağın yaşı və anlayışına uyğun bir şəkildə izah etmək.

5. Uşaqlarına niyə namaz qılındığını öyrət. Onlara, mömin bir insanın Allah sevgisindən ötrü namaz qıldığını, qiyamət günü namaz qılanlara cənnətin veriləcəyini, namazın dinin rükunlarından olduğunu və namazın iman edənlərin şüarı olduğunu açıqla.[20]

6. Valideynlər davranışlarıyla, namaza bağlılıqlarıyla və namazı ədəb və ərkanıyla vaxtında qılmağa olan həvəsləriylə uşaqlarına gözəl örnək olmalıdırlar.

7. Təqlid ediləcək model ana-ata ilə uşaqları arasında sevgi və rəhmətlə üstün bir əlaqə olduğu vaxt örnək götürülən bu model namazın uşaq tərəfindən qılınmasını asanlaşdırıb dəstəkləyəcəkdir. Necə ki, uşağın valideyni ilə uzun müddət sürən yaxın təması, onlarla çox oturub-durması, valideynin uşaqlarıyla uzun bərabərliyi, uşağın oyun və əyləncələrində

---

[20] Tərcüməçidən: Çox təəssüf edirəm ki, mən həyatda, cəmiyyətimizdə, qohumlar arasında belə uşaqları namaza dəvət vaxtı belə çətinliklə qrşılaşdım. Valideynlərdən bir çoxu uşaqlarında namaza meyl hiss etdikdə təlaşa düşür və orada-burada, məclislərdə, qohumlar yanında uşağının səhv yola düşdüyünü, mollalıq etdiyini buna nə çarə tapacaqlarını söhbət edirlər. Mən uşaqlara namazı öyrədəndə belə onların valideynləri övladlarına namaz qılmağa icazə vermədilər və həmin uşaqların indiki vəziyyətinə baxdıqda valideynlər özləri onların əməllərindən razılıq etmirlər. Amma mən atama öz dərin təşəkkürümü bildirməyi borc bilirəm. Çünki ilk dəfə namaza başladığımı eşitdikdə sevindi və mənə ən qiymətli bir hədiyyə aldı. Həmin hədiyyəyə görə hələ o vaxt məndə namaza olan sevgi və rəğbət artmışdı. Bütün valideynlərin bu inanc və şüur içərisində olmalarını arzu edirəm.

iştirak etmələri örnək götürməyi tezləşdirər və əmr ediləni yerinə yetirməkdə böyük bir rola sahib olar.

8. Uşaqların söhbət edəcəyi insanların namaz qılanlardan seçilməsi. Hədisi şərifdə də ifadə edildiyi kimi insan dostunun dinindədir. Dostun, yaxının yeri ,davranış, əxlaq və gedişatda insana olan təsiri əhəmiyyətsiz hesab edilməməlidir. Dostu məsciddə Quran öyrənənlərdən də seçmək olar. Əgər hər hansısa bir məsciddə Quran öyrənənlər dəstəsi yoxdursa yaşayış yerində olan sakinlər yaxınlarında olan məscidlərində Quran öyrənmək üçün dərslər təşkil etməlidirlər.[21]

9. Təşviq, sevindirmə və istiqamət vermə metoduna dayanmalıdır. Bir işin icra olunmasına duyulan arzu, o işi gerçəkləşdirmək üçün qüvvətli bir ünsürdür.[22] Bu təşviq metodunu tədbiq etmənin bir çox yolu vardır. Məsələn: gözəl bir işdən ötrü tərifləmək və tərifin böyüklər və qohum-əqrəbanın yanında olması, namaza təzə başlayanda hədiyyə

---

[21] Tərcüməçidən: Müəlliflərin bəhs etdiyi Quran öyrənmə yeri, bizim Quran kursu adlandırdığımız kurslardır. Təəssüf ki, bizdə belə kurslar çox azdır ve bəzən isə belə kursların fəaliyyətinə icazə verilmir. Amma buna baxmayaraq icazəsi olan bəzi məscidlərdə Quran dəsrləri öyrədilir. Buna misal olaraq mən bildiyim BDU – nun İlahiyyat fakultəsinin məscidi, Şəhidlər xiyabanının yanında olan məscid, Abubakr məscidi və bəzi az sayda məscidlər vardır ki, orada Quran dərsi tədris olunur. Amma ürək istəyərdi ki, Sumqayıt şəhərində bağlanan məsciddə açılsın və Sumqayıt camaatı da buradan faydalansın. Şəkidə çox gözəl Quran kursları və hafiz tələbələr yetişdirilir ki, bütün bunlar Bakı-Abşeron və ətraf rayonlarda da təşkil olunmalıdır. Rayonlarımızda bir çox məscidlərin qapılarını bağlı gördükdə müsəlman olan hər kəsdə narahatçılıq yaranır. Bizdə kifayət qədər mütəxəssislər də vardır. Ümid edirik ki, dövlətimiz bu sahədə əhəmiyyətli tədbirlər görəcəkdir.

[22] Tərcüməçidən: Axşama qədər bayırda oynayan, qaçıb qovalayan övladımız yorulmaz, amma biz onu öz oyunundan çağırdıqda yorğun-arğın bir əda ilə gəldiyini görərik. Yenə ondan çox kiçik bir şey istədikdə özünü yorğun və təmbəl göstərər. Həqiqətdə isə bunun səbəbi uşağın oyunu istəyərək oynaması, bizim istəyimizə qarşı isə istəksiz olmasından ötrüdür. Bu vəziyyət təkcə uşaqlara xas deyil, əksinə bütün insanlar üçün olan bir xüsusiyyətdir.

vermək, eyni şəkildə yaxşılıq və həvəsləndirmə ifadələriylə duyğuları hərəkətə gətirmək bunlardan bəziləridir.

10. Uşaqları namaza vərdiş elətdirmək üçün iki bayram və cümə namazı kimi islami fürsətlər dəyərləndirilməlidir.

11. Uşağa itaət etməsi əmr edilərkən aşağıdakı xüsusiyyətlərə riayət edilməlidir:

A- Uşaq sevdiyi başqa bir şeylə məşğul olarkən, uşağa heç nə əmr edilməməlidir.

B- Edilməsi istənilən işin açıq və sadə olmasına çalışmalıdır.

C- Bir vaxtda bir çox əmr verilməməlidir.

D- Uşağı verilən əmri tədbiq etməsi üçün təqib etməli və yerinə yetirilmə müddəti yoxlanılıb gözdən keçirilməlidir.

E- Uşaqda həvəs oyandıracaq təşviqkar ifadələr istifadə edilməlidir.

12. Valideynlər uşaqlarının düzəlməsi üçün çox dua etməlidirlər. Çünki dua və Allaha sığınma, uşaqların islahında çox böyük bir təsirdir. Bilindiyi kimi ana-atanın övladına etdiyi dua, inşallah qəbuldur. Peyğəmbərimiz (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) belə buyurur: "Üç duanın qəbul olunmasında heç bir şübhə yoxdur: Məzlumun duası, qonağın duası və atanın övladına duası".[23]

Dua, ana-atanın əhəmiyyət verməsi lazım olan, Allahın özlərinə bir yaxşılığıdır. Allahın onları qoruması, islah etməsi və hidayətə yönəltməsinə ümid edərək övladlarımıza dua etməliyik. Edilməsi lazım dualardan biri də Allah təalanın bu kəlamındakı duadır:

*"- Və o kəslər ki: "Ey Rəbbimiz, bizə zövcələrimizdən və uşaqlarımızdan (sənə itaət eməklə bizi sevindirib) gözümüzün işığı (bəbəyi) olacaq övladlar ehsan buyur və bizi müttəqilərə imam (rəhbər) et! – deyərlər".*[24]

---

[23] İbn Macə, 3853, əl-Əlbani həsən demişdir.
[24] əl-Furqan (Fərqləndirmə) surəsi, 74

Ana-ata uşağına bəd dua etməkdən çəkinməlidir. Çünki, ana-atanın övladına xeyirli duası kimi bədduası da qəbul edilir.

## 2. Yeddi yaşdan əvvəlki mərhələ

Uşaq bu mərhələdə, xüsusilə təmyiz yaşından əvvəlki ömrünün ilk illərində ailə fərdlərini təqlid edər. Bu mərhələdə uşaq ana-atasının və ailə fərdlərinin namazlarını qılmalarına fikir verər.

Bu səbəblə ana-ata uşağın həyatındakı bu dövrü əhəmiyyətli hesab etməli və uşağa birbaşa və təkrar-təkrar namazı əmr etməkdən çəkinməlidir. Əsas bu mərhələdə hədəf uşağı namazın şəklinə və namazdakı işlərə alışdırmaq olmalıdır. Uşaq ana-atasını namaz qılan görməlidir. Bu da atanın nafilə və fərzlərlə birlikdə qılınan sünnət namazları evində və uşaqlarının hüzurunda qılmasıyla olar.

Yenə ata məscidə getmək üçün evindən çıxmadan əvvəl övladlarına məscidə getdiyini xəbər verməlidir. Nafilə namazların evdə qılınmasının məsciddə qılınmasından daha üstün olduğu bilinən bir xüsusiyyətdir. Məhəmməd peyğəmbər (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) bu barədə belə demişdir: “Namazlarınızdan bir pay da evlərinizə saxlayın. Evlərinizi qəbirlərə çevirməyin”[25], “Fərzdən başqa kişinin qıldığı ən üstün namaz evində qıldığı namazdır”[26]. Bax bu hədislər, nafilə namazları evdə qılmağa təşviq edir. Şübhəsiz ki, qat-qat savab və Allahdan mükafat əldə etməklə bərabər bu namazlar səbəbilə evlərdə bərəkət olur. Həmçinin, bu namazlar səbəbilə kiçik uşaqlarda dərin və sağlam bir tərbiyə də əldə edilmiş olur. Çünki kiçiklər, Allaha səcdə edərək üzlərini yerlərə sürtən, hüzurunda hörmətlə qalxıb-duran, sağa-sola baxmadan özünü ibadətə verən ana-atalarını izləyərlər. Kiçiklərin önündə hər gün təkrarlanan bu mənzərə

---

[25] Buxari və Müslimin ittifaq etdiyi hədisdir.
[26] Buxari.

onların qəlblərində Allahın əzəməti və Allahın yeri işıqlanacaqdır. Bununla birlikdə atanın namaza yönəlişi, namazı uşaqlara sevdirəcəkdir. Belə ki, onlar namaz qılanı görərək, vərdiş edərək təkbiri, rükusu, səcdəsi və qiyamıyla namaz əməllərini də öyrənmiş olacaqlar.

Çox vaxt kiçik uşaq, istəkli bir şəkildə atasını təqlid etməyə yönəlir. Qiyamında, rükusunda, səcdəsində heç bir şey anlamasa da, atasına tabe olaraq yanında durur. Şübhəsiz ki, uşağın həyatında hər gün təkrarlanan bu səhnə uşağın zehninə namazın qeyri adi bir şey olmayan, normal bir şey kimi yerləşdirir. Beləliklə, təmyiz yaşına çatmadan namaz uşaq tərəfindən istək və arzuyla asanca əda edilməyə başlanmış olur.

Atanın hələ təmyiz yaşına çatmamış kiçik uşağının dəstəmaz alması və övrət yerlərini örtməsi xüsusunda işi sıx tutmaması lazımdır. Belə ki, onu öz halına buraxmalıdır. Həmçinin uşağını rüku və səcdəsində özünü təqlid etməsindən də danlayıb uzaqlaşdırmamalıdır.

Çünki, bu yaşlarda hələ mükəlləf olmayan uşağı danlamaq, ona sərt və qatı davranmaq, uşağın namazdan nifrət etməsinə və xoşlamamasına səbəb olacaqdır.

Uşaq, təlim yaşına çatdığı vaxt ata uşağa Fatihə surəsi və bəzi qısa surələri oxumağı öyrətməli və bunları əzbərləməsi üçün zəhmət çəkməlidir. Həmçinin rüku və səcdənin bəzi zikirlərini də öyrətməlidir.

Uşağın valideyni, onu məsciddəki Quran dərslərinə apara bilər. Qurandan qısa surələri əzbərlətməklə məşğul olan səlahiyyətli şəxsə - bu şəxsin güvənilən, etibarlı, səmimi və bu yaşlardakı uşaqlara hikmətlə davrana biləcək qüdrətdə olması şərtiylə həmin adamın yanına göndərə bilər.[27] Uşaq yeddi yaşına yaxınlaşanda ata, uşağına namazı əmr edəcəyini və onu

---

[27] Türk dilinə tərcümə edəndən: Bizim ölkəmizdə bu iş belə olmalıdır: Valideyn, özü bilirsə öz övladına qısa surələri əzbərlətdirməlidir. Bilmirlərsə elmli birini tapıb müəyyən günlərdə evlərində əzbərlətmə işini həyata keçirməlidirlər.

namazla məsul tutacağını xatırlatmalıdır. Uşağa yaxın günlərdə özünün şəxsiyyətli insan olacağını və digər insanlar kimi məscidə getmə vaxtının gələcəyini ona gözlətdirməlidir.[28]

Kitabxanalarda olan namaz və dəstəmazın əsasını açıqlayan, içərisində namaz və dəstəmazın bəzi zikirləri olan şəkilli kitablar alaraq uşaqlara bunları rənglətdirməsi əmr edilməlidir. Ata bunlardan gözəl bir şəkildə istifadə edəcəyi kimi, bu mərhələdə, uşaqlar tərəfindən oxunan ibadət, namaz, Quran və digər əxlaqi məlumatları əhatə edən kaset və cd-lərdən də istifadə edə bilər.

## 3. Vərdiş mərhələsi (Yeddi – on yaş arası)

1. Dəstəmazı öyrətmək. İstənilən şəkildə namazı düzgün qılmasına hazırlıq üçün yeddi yaş və bir az əvvəl ata, gözəl dəstəmaz almağa və təmizliyə uşağı öyrətməlidir. Buna vərdiş etdirməlidir. Uşağa necə təmizlənəcəyini, açıq və gizlində olan əzalarını necə təmizləməsini öyrətməlidir. Uşağa gizli üzvlərini kinayə etmədən dində bilinən adlarıyla adlandıraraq su ilə istinca etməsini əmr edərək təmizlənməsini istəməlidir. Sonra

---

[28] Tərcüməçidən: Bizdə isə tamamilə əksinə kimi görsənir. Çünki bu gün bizim valideynlərimiz yetmiş illik ateizm təhsilindən çıxıb bizə məscidə getməyi təşviq etmək əvəzinə, o xeyirdən uzaqlaşdıraraq məscidlərin təhlükəli olduğunu və ora gələnlərin düz olmadığını öyrədirlər. Bu gün elmi olan valideynlər Allahdan qorxaraq övladlarını özləri ilə namaz vaxtlarında məscidə aparır və onlara Allahın razılığını bəxş edirlər. Elmi olmayanlar isə məscidə gedən övladına mane olur, həm özü xeyirdən məhrum olur, həmdə övladını məhrum edir. Her yerdə övladının məscidə getdiyini bəyan edir, təhlükəli yola düşdüyünü zənn edir ve bunu digər insanlara aşılayır. Qəflətdə olan insan anlamır ki, təhlükəli olan yerdə və vəziyyətdə özüdür. Məscidə gedən övladı isə xeyir içərisindədir. Doğrudan da İblis səhvi insanlara düz kimi, düzü də səhv kimi göstərir. Allah Təala bizi və bizdən sonra gələn saleh övladlarımızı daima məscidə bağlı, Allahın adını uca tutan, Allahın razı qaldığı qullarından etsin. Amin.

uşağın qarşısında ata şəxsən özü yavaş-yavaş dəstəmaz alaraq, uşaq dəstəmaz əzalarının sırasını əzbərləyənə qədər bir neçə dəfə təkrarlayaraq uşağa dəstəmazın praktikasını etdirməlidir. Ata, uşağın suyun isti və soyuqluğundan nifrət etməməsi üçün ilıq dəstəmaz suyundan istifadə etməlidir. Əgər dəstəmaz almağı yayda öyrədirsə mövsümün istiliyinə görə uşaq sərinləməyinə görə buna daha çox meyl edəcəkdir. Kiçik uşaqlara dəstəmaz almağı öyrədən şəkilli kitablarla da uşaq dəstəklənə bilər.

Ata qarşısında uşağın praktik olaraq dəstəmaz almasına fürsət verməlidir. Əgər bir xəta edərsə, hirslənmədən, xoş üslubla uşağa doğrunu öyrətməlidir. Doğru və gözəl dəstəmaz aldıqda isə, razı olduğunu hiss etdirmək üçün mərhəmətlə sarılıb öpməlidir.

Atanın sadəcə dəstəmazı və sünnələrini nəzəri olaraq öyrətməsi kifayət deyildir. Bununla bərabər dəstəmaz alarkən işin əhəmiyyətli olan mənəvi tərəfinə də diqqət çəkməlidir. Belə ki, dəstəmazı Allahın əmr etdiyini, Peyğəmbərin də bizə necə alındığını öyrətdiyi və müsəlmanların dəstəmaz alıb üzvlərin sırasıyla yuyulmasında Peyğəmbərə tabe olduqlarını deməlidir. Uşağın ruhunda dəstəmaz sevgisi və istəyi yerləşsin deyə dəstəmazın fəzilətləri açıqlanmalıdır. Çünki Peyğəmbər (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) belə buyurmuşdur: "Müsəlman dəstəmaz aldıqda qulağı, gözü, əlləri və ayaqlarıyla işlətdiyi günahları tökülür. Əgər (dəstəmazdan sonra) oturarsa, bağışlanmış olaraq oturar".[29] Uşağa dəstəmazın mənəvi tərəfini öyrətməklə bərabər eyni zamanda dəstəmazın bədən və ruh təmizliyi olduğu da öyrədilməlidir.

2. Ata uşağa təmizlik, övrət yerlərini örtmə, qibləyə yönəlməyə aid namazın şərtlərini öyrətdiyi kimi eyni zamanda "Səmiallahu limən həmidəh" kimi həmd etmə, təşəhhüd, salavat və.s. dualardan da mümkün olan qədər əzbərlətməlidir.

[29] Əhməd, Hədis № 21150

3. Uşağa məsciddə olma ədəbi, məscidin Allahın evi olduğu və yaxşı insanların görüş yeri olduğu öyrədilməlidir. Məscidə getdikdə sürpiriz olmaması üçün orada necə ibadət ediləcəyi də öyrədilməlidir.

4. Uşaqla bərabər Cümə namazına getməli, Cümə namazı həftəlik bir fürsət bilinərək xüsusilə oğlan uşaqlarına paltar və gözəl ətirlər hədiyyə edilməlidir. Dəyişik məscidlərə və xütbəni uzatmayan imama qulaq asmağa aparmaqda, həmçinin böyük məscidlərə aparmaqda heç bir təhlükə və ya qəbahət yoxdur.

Ata Cümə namazını qılıb məsciddən çıxdıqdan sonra övladının xütbədən nə başa düşdüyünü öyrənmək məqsədiylə xütbənin mövzusundan söhbət etməlidir.

Əgər uşaq, oyun oynamağa və buna bənzər işlərə meylindən başqa, bilinən heç bir bəhanəsi olmadan Cüməyə gəlmək istəməsə, böyüyüb on yaşına çatdıqda Cümə namazının fəzilətini anlayıb və istəyərək özlüyündən Cümə namazına gedənə qədər övladını sərbəst buraxmasında bir təhlükə yoxdur.

Əbu Hüreyrə (r.a) də kiçik uşağı öz arzusuyla baş-başa qoymaqda heç bir problemin olmadığı fikrindədir. Buna görə də uşağın Cümə namazına gəlməsinə məcbur etmək olmaz. Rəvayət edildiyinə görə o, bir gün Cümə namazı üçün məscidə girir. Orada bir uşaq görür və ona: “Ey uşaq, get oyna!” deyir. Uşaq: “Mən məscidə gəlmişəm” deyir və Əbu Hüreyrə (r.a): “Ey uşaq get oyna!” deyir. Uşaq yenə də: “Mən məscidə gəlmişəm” deyir və oturur. İmam xütbəyə çıxdıqda uşaq deyir: “Mən getməliyəm” deyir. Bu rəvayətdə Əbu Hüreyrənin anlayışı və qabağı gürməsi açıqca görünür. Çünki uşağa dəstəmazını saxlama, imam xütbəyə çıxana qədər oynamadan uzun müddət oturma və imama qulaq asıb, namaz qılma kimi gücü çatmayan şeyləri yükləmir. Uşaq onsuzda bunlarla cavabdeh deyildir. Bu mövzuda uşağın xoşlamadığını və etmədiyini, uşağa sərt davranaraq ona məcbur etmək,

böyüdükdə bunu yerinə yetirmək ona çətin olması və istənilən kimi yerinə yetirməməsi deməkdir.

Ata bu barədə sələf alimlərinə tabe olmalıdır. Belə ki, on yaşına çatmamış bir uşağa Cümə namazını fərz etməməlidir. Əksinə qorxutmadan təşviq etmə üsulunu mənimsəməlidir. Əgər uşaq Cümə namazına gələrsə, nə əla olar, gəlməzsə uşaq öz istəyinə buraxılmalıdır. Ta ki, on yaşına çatana və ya on yaşına yaxın vaxta qədər belə davranmalıdır. Bu yaşa gəldikdə məcbur etməlidir.

5. Ata uşaqların sevdiyi şeyləri namaza bağlamağa çalışmalıdır. Deyək ki, uşaqları gəzməyə aparacaqsa, bunun vaxtını namazlara bağlamalıdır. Məsələn: günorta namazını qıldıqdan sonraya, əsr namazını qıldıqdan sonraya bağlamalıdır. Bu, uşaqların sevdiyi şeylə bağlandığına görə bu namazları unutmadan vaxtında qılmalarına təşviq edəcəkdir. Ata uşaqları ilə olan bütün əyləncələrini namaz vaxtlarıyla nizamlamalıdır. Beləliklə, uşaqlar vaxtın nizamını və namaz vaxtlarına görə dağılmağı öyrənmiş olarlar. Bununla bərabər bu cür əyləncələr bu namazların uşaqlar tərəfindən vaxtında qılınmasını da təmin etmiş olar. Yenə ata oğlunu, məsciddəki Quran öyrənmə yerlərindən dostlar seçsin deyə məsciddəki dərslərə apararaq ona məscidi sevdirə bilər.

6. Uşağın qılacağı ilk fərz namazda təbrik etmək. Uşaq yeddi yaşına çatdıqda, ana-ata bu fürsəti əldən verməməlidir. “Valadi” jurnalı 1991-ci ilin 1-ci sayında yeddi yaşına çatan uşaqlar üçün bir yığıncaq təşkil edən Səudiyyə Ərəbistanlı bir ailənin heykayəsini danışır. Bu mərasimə ailənin bütün fərdləri qoşulur. Mərasim isə nənənin namazın dindəki yeri və dinin dirəyi olmasını açıqlayan söhbətiylə başlayır. Sonra bu söhbəti dayının, uşaqları namaza vərdiş etdirmənin əhəmiyyətindən bəhs edən çıxışı təqib edir.

Ana bu mərasimin uşağın duyğularını hərəkətə gətirməkdə və namazlarını qoruma xüsusundakı arzusunu artırmada çox təsirli olduğunu açıqlayır. Ana-ata olaraq, uşaqlarının namazı

qoruması üçün həyatında yeni bir mərhələyə girməsi münasibətiylə hazırlıq olmasından bənzərsiz duyğular hiss etdiklərini rəvayət edirlər.

7. Tərbiyədə mükafatlandırma üsulundan istifadə etmək (təşviq). Əgər uşağın qəlbində gözəl duyğular meydana gəlməsini istəyiriksə, onu vicdanən rahatlanmağa aparan xoş bir davranışda olduqda onu mükafatlandırmağa çalışmalıyıq. Mükafat, bəzən bir oyuncaq vermək, bəzən gözəl bir şirniyyat almaq, bəzən pul vermək kimi maddi bir şey ola bilər. Bəzən də uşağı sevindirəcək bir şəkildə onu tərifləmək, ona qarşı xoş təbəssüm etmək, etdiyi gözəl bir davranışa görə insanlar qarşısında iftixar etmək şəklində mənəvi də ola bilər.

Amma yaxşılığa doğru olan tərifdə həddini aşmaq islam ədəbinə uyğun deyildir. Həmçnin tərifdə həddini aşmamaq, islam tərbiyəsinin bir təlimatıdır. Bu səbəblə tərbiyəçi dəyərini itirməməsi və uşağı qürurlandırmaması üçün tərif ifadələrindən çox istifadə etməməlidir.

Eyni zamanda maddi mükafat, gələcəkdə uşağın ruhunda pis bir təsir buraxacaq şəkildə əsas məqsəd halına da gətirilməməlidir. Ancaq maddi və mənəvi mükafat ölçüdən kənara çıxmamalıdır.

8. Uşaqları namaza təşviq edəcək bəlli vasitələrdən bəziləri də bunlardır: Uşaqların otağına namaz vaxtlarını göstərən bir vərəq qoymaq. Beləcə uşaqlar hər namazdan sonra namaz qıldıqlarını göstərən bir izahla bu vərəqi doldurarlar. Əgər evdə yeddi yaşında bir neçə uşaq varsa, bu vərəqlə aralarında xeyirlə yarış müsaqibəsi də tədbiq oluna bilər. Vaxtında və camaatla namaza ən çox çalışanlara həftəlik mükafatları verilə bilər.

9. Belə də etmək olar. Uşaqlardan namaz vaxtlarını xatırladan, üzərində hərəkət edən əqrəbi olan kağızdan bir saat düzəldib evə asmaları istənilə bilər.

10. Qız uşağı yeddi yaşına gəldikdə ona namaz vaxtları gəldikdə geyəcəyi bir paltar hədiyyə edilərək, namaza təşviq edilə bilər.

11. Bu mərhələdə heç nədən bezmədən uşağa namazı xatırlatmağımız və bu xüsusda onu izləmənin əhəmiyyətini vurğulamaq lazımdır. Bu mərhələni Allah təala nisbətən uzun bir müddət etmişdir ki, ana-ata uşaqlarına namazı və hökmlərini öyrətsin, uşaqları namaza vərdiş etdirsin və hər hansı bir əmr və istək olmadan, qəlbdən gələn bir istəklə namazlarını müntəzəm olaraq qılmaq üçün bütün yollara baş vursunlar.

12. Ana-ata bu yaşlardakı uşaqlarına qarşı dayaqdan istifadə etməməlidirlər. Dayaq ancaq on yaşını keçdikdən sonra israr edib namaz qılmadıqlarında tədbiq oluna bilər.

13. Ailə gəzintilərində oğlan uşağı azan və iqaməyə vərdiş olunmalıdır. Yenə bu cür gəzintilərdə öz yaşıdlarına imamlıq etməyə də vərdiş oluna bilər.

14. Uşağı azan oxuyarkən, iqamə edərkən və dostlarıyla namaz qılarkən vidyo kamerayla çəkmək və vaxtlı vaxtında bu kaseti ailəyə seyr etdirmək.

## 4. On yaş mərhələsi

Bu mərhələ, müsəlmana namazın fərz olmasından və həddi büluğ çağından əvvəlki mərhələdir. Namazın fərz olması, bu mərhələnin sonunda qız və ya oğlan uşağı həddi büluğ çağına çatanda başlayır. Ona görə də uşaq on yaşına gəldikdə aşağıdakılara riayət edilməlidir:

1. Oğlan və ya qız uşağı qaçırdığı, ötürdüyü fərz namazı qəza etməklə əmr olunur.

2. Eyni şəkildə ana-ata uşağa fərzlərlə birlikdə “ratibə” adlanan nafilə və sünnət, vitr namazını da əmr etməlidir.

Fərzləri təqib etdikləri kimi bu namazlara da davam edilməlidir.

3. Ana-ata uşağa namazın bəzi zikirlərini əzbərlətməli və səhv səcdəsi kimi bəzi hökmlərini də öyrətməlidir.

4. Ata, oğlan uşağını cümə namazına aparmağa cəhd göstərməlidir və cümə namazını ona əmr etməlidir. Oğlan uşağı camaat namazlarında iştirak etməklə müsəlmanların məclislərinə vərdiş edər, böyük alimlərini tanıyar, onların vəəz və xütbələrini dinləməyin ədəbini də öyrənmiş olar. Beləliklə, namaz qılmağa vərdiş etməklə bərabər ruhi qidanı da almış olar.

Uşaq, uşaqlıq dövrünün son mərhələsində təbiətinə uyğun olaraq ibadət mərasimlərində böyüklərə qarışmağa meyl edər və ibadət vaxtları onlarla birlikdə olmaqdan ləzzət alar. Bu səbəblə ata bu meyli dəyərləndirməli və müxtəlif tərbiyə üsulları ilə bunu inkişaf etdirməlidir.

5. Oğlan və ya qız uşaqlarının bu mərhələdə namaza olan istəklərinə kömək edən vasitələrdən biri də “Vələdi” jurnalının (1/1999) bir atadan sitat gətirdiyi bu sözüdür: “Biz məsciddən çıxarkən, əlimdən tutan o isti əli heç vaxt unuda bilmərəm. Bu an belə onun istiliyi vücudumda dolaşır. O əl, özüylə məscidə davam etdiyim atamın əlidir...

O əli hər dəfə xatırladıqda, oğlumu körpəlikdə namaza vərdiş etdirmənin nə qədər əhəmiyyətli olduğunu hiss edirəm...

Uşağımla çox məşğul oldum. Amma onunla olan problemim çox oyunlar oynaması və unutqan olması idi. Doqquz yaşında olmasına baxmayaraq əgər biri ona namazı xatırlatmazdısa, bütün fərzləri yerinə yetirmirdi. Xüsusilə də gününü xalauşaqları ilə bayırda keçirdiyi vaxt. Ağlıma ona kiçik bacısına namazları öyrətməsi və bütün namazlarında onu yoxlamaqla məsul tutması düşüncəsi gəldi. İkisi üçün də nəticə nə qədər möhtəşəm oldu! Bacısı namaza hazırlaşıb, namaz paltarlarını geyincə, birlikdə namaz qılması üçün qardaşını

çağırırdı. Həqiqətən də mən belə bir nəticəni heç gözləmirdim”.

6. Uşaqlara namazın əhəmiyyətini açıqlayan kitab və kasetlər almaq və ailəlikcə oxumaq və dinləmək. Sonra da onu müzakirə etmək. Namazın əhəmiyyətini açıqlaması üçün ən böyük fürsəti də uşağa vermək.

7. Ana-ata bu yaşlardakı uşaqlarını yaxşı dostlarıyla söhbət etmək üçün bir yerə gətirməyə çalışmalıdır ki, onlarla birlikdə namaza vərdiş etsin və namazlarına davam etsinlər. Çünki insan dostunun dinindəndir.

8. Uşaq on yaşına çatdıqdan sonra fərz namazın ədasında qüsurlu davranarsa, atanın ona öyüd verməsi, xatırlatması, Allah və Rəsulunun əmrlərini ona mənimsətməsi və dəlil gətirməsi lazımdır.

Əgər namaza qarşı səhlənkarlığı davam edərsə, ona ağır sözlər deməli, tənqid etməli, onunla danışmağı, zarafatlaşmağı, səmimiyyəti tərk etməli və sevdiyi şeylərdən onu məhrum etməlidir. Bu cür psixolojik cəzalar uşağın ruhunda güclü bir iz qoyar.

Bir çox uşaq üçün bunlar bədəni cəzalardan daha xeyirlidir.

Burada tərbiyədə cəzanın yeri barədə dayanmaq lazımdır.

## 5. Tərbiyədə cəzanın yeri

Bir çoxlarının fikirləşdiyi kimi tərbiyə; döymək, söymək, şiddət və təhqir deyildir. Tərbiyə, ancaq yeni yetişməkdə olan gəncin mümkün olan kamala çatdırılmasıdır. ..

Üstəlik dinimiz kiçik uşağa məsuliyyət yükləməmişdir. Cəzaya meyl etdirməyi dayaqdan başqasıyla düzəlməyəcək insanların müalicəsində tərbiyəçiyə köməkçi bir səbəb kimi görmüşdür... Bu da ancaq, Məhəmməd peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) hədisində də göründüyü kimi təmyiz yaşından sonra üçün lazımdır: “Yeddi yaşındakı Uşağınıza namazı əmr edin. On yaşında əgər qılmasa

döyün”.[30] Bu hədisdən, uşağı namaza vərdiş etdirmək üçün on yaşından əvvəl döyməyin doğru olmadığını başa düşürük.[31] Buradakı ədədbləndirmənin döyməkdən başqa bir şeylə olması yaxşıdır.

A- Peyğəmbərin (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) istiqamət verməsindən biri də uşaqlara ailə qorxusunu və xəta edəni cəzalandıracaqlarını hiss etdirməkdir. Səhih bir hədisdə belə buyrulmuşdur: “Dəyənəyi ailə fərdlərinin görəcəyi yerə asın. Çünki, bu onlar üçün ədəbdir”.[32] Şübhəsiz ki, dəyənəyin görünməsi istifadə edilməsinə şərait yaratmaz.

B- Cəzanın növü isə, mütləq uşaqda ağrı verəcək şəkildə olmamalıdır. Yüngül, normal bir danlağın və sərt bir səs tonunun, gözəl bir uşaqda meydana gətirdiyi tərbiyə, dayağa vərdiş edilmiş bir uşağa tədbiq olunan sərt bədəni cəzanın meydana gətirdiyindən az deyildir. Cəza artırıldıqca uşaqdakı təsiri də o nisbətlə azalır. Əksinə uşağı üsyana və qərarsızlığa aparması daha çox müşahidə olunur.

C- Cəzanın yaşa uyğun olması və dərhal günahın ardından gəlməsi lazımdır.

D- Cəzanın heç vaxt lağa qoyma, ələ salma, pis ləqəb qoyma şəklində olmaması lazımdır. Allah Təala belə buyurur:

*“- Ey iman gətirənlər! Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, onlar (lağa qoyulanlar) o birilərindən (lağa qoyanlardan Allah yanında) daha yaxşı olsunlar. Qadınlar da*

---

[30] Əbu Davud, Hədis № 418, Əhməd.

[31] Tərcüməçidən: Ən gözəli o olardı ki, biz uşaqlarımızı döyməklə tərbiyə etməyək. Burada da elə başa düşülməsin ki, Peyğəmbərimiz (Allahın salamı və xeyir bərəkəti peyğəmbərin üzərinə olsun) uşaqlarımızı döyməklə tərbiyə etməyi bizə öyrədib. Biz elə gözəl tərbiyə üsulları tapmalıyıq ki, Peyğəmbərimizin (Allahın salamı və xeyir bərəkəti peyğəmbərin üzərinə olsun) əmr etdiyi döymə üsuluna ehtiyac qalmasın. Peyğəmbərimiz (Allahın salamı və xeyir bərəkəti peyğəmbərin üzərinə olsun) bunu ən son məqamda artıq başqa bir üsul tapa bilmədikdə icra etməyimizi bizə əmr edib.

[32] Baxın: “Səhihul Cami”

*bir-birinə (rişxənd eləməsinlər). Bəlkə, onlar (rişxənd olunanlar) o birilərindən (rişxənd edənlərdən) daha yaxşıdırlar. Bir-birinizə tənə etməyin (ayıb tutmayın) və bir-birinizi pis ləqəblərlə (ey kafir, ey fasiq, ey münafiq və i. a.) çağırmayın. İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir. Məhz tövbə etməyənlər zalımlardır! (Özlərinə zülm edənlərdir!)”*[33]

Bu Rəbbani ədəb harada, uşaqlarına “Ey gic!.. Ey kor!.. Ey topal” deyə çığıraraq, uşaqların şərəfini təhqir edən və ya uşaqların “Ey yalançı..! Ey oğru! deyə çağıraraq, ayıblayıb, onları batilə düşməyə məcbur edənlər harada?

H- Tərbiyəçinin uşaqları vurması, fəqihlərimizin çəkdiyi sərhəddi keçməməlidir. Bu sərhədlər, tərbiyəçinin üzə və öldürücü yerlərə vurmaqdan qaçmağını göstərir. Müslümün rəvayətinə görə: Məhəmməd peyğəmbər (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun) belə buyurur: “Sizdən biri vurduqda üzə vurmaqdan çəkinsin”. Həm də vurmaqdan məqsəd çəkindirməkdir, öldürmək deyil. Sonra vurmanın keyfiyyəti də ancaq bir yerə deyil, müxtəlif yerlərə olmalıdır.

I- Hər bir halda əsas olan prinsiplərdə möhkəm olmalı, övladlar arasında ədalətli, bərabər davranmalı, aralarında adil olmalı, qəlbi nifrət etdirən zülmdən uzaq durulmalıdır. Onsuzda zalımlıqla edilən cəza zərərdən başqa bir fayda gətirməz.

J- Eyni şəkildə, ilk dəfə meydana gələn bir xətadan ötrü veriləcək cəza da yüngül olmalıdır. Ancaq tərbiyəçi böyük xətadan ötrü, o xətaya əngəl olmaq üçün ən faydalı olanı tədbiq edə bilər. Bununla yanaşı günahı yüngül hesab etməmələri üçün şiddətli cəzanı istifadə etməkdə bir təhlükə yoxdur. Amma uşağa cəza valideynlərdən biri tərəfindən verilərsə, digərinin də verilən cəzaya dəstək olması lazımdır, əks təqdirdə cəzanın heç bir faydası olmaz. Eyni zamanda cəzanın uşaqdan bir öc alma deyil, onun faydasına olduğu da hiss etdirilməlidir.

[33] əl-Hucurat (Otaqlar) surəsi, 11

Uşaq bunun əksinə bir vəziyyət hiss edərsə, nəfsində bir səhv yola meyllik meydana gələr. Bu səhv yol ana-atasının vəlvələsindən və həyəcanlanmalarından zövq almaq üçün onları hirsləndirməyə yönəldər. Şəxsi aləmində böyükləri təhqir edə bilmiş bir uşaq olaraq bir qürurluq və rahatçılıq hiss edərlər.

Bu səbəblə dərrakəli bir ataya yaraşan odur ki, uşağı cəzalandırmaqda tədrici bir yol izləsin. Cəzaya başladıqda uşağı müdafiə etmədən başlamalıdır. Sonra uşaqdan üz çevirmək, ondan razı olmadığını bildirmək, sonra danlamaq, üz turşutmaq, qaşqabaq tökmək, bundan sonra onu tərk edib əlaqələri kəsmək, daha sonra da sevdiklərindən məhrum etmək və buna bənzər cəzalar... Ta o vaxta qədər ki, bədəni cəzanın vaxtı çatana qədər. Bədəni cəza da yüngüldən şiddətliyə doğru tədricən olmalıdır. Bu sonuncu ən ağır cəza sayılmalıdır.

Bu məsələdə işin əsli; ümumi olaraq uşağın bütün həyatında mümkün qədər dayaqdan uzaq durulmalıdır. Əgər mütləq cəza vermək lazımdırsa,cəzanın mənası, səbəbi və bunu qazanan uşaq tərəfindən mənimsəniləcək bir vaxtda olmalıdır. Həmçinin cəza, uşaq cəzayla təhdid edildikdən sonra olmalı, ata yuxarıda sayılan tədriciliyə riayət edərək həyata keçirilməlidir. Cəzanın həyata keçirilməsində uşaq, özündən intiqam və qisas alındığını hiss etməyəcək şəkildə normal olmalıdır. Əksinə cəza, uşağın başa düşməsi və cəzanın səbəbini qavraya bilməsi üçün günahla bağlı olmalıdır. Əgər ata uşağına cəza tədbiq edərkən, uşaq Allahdan kömək istəyər və Onu xatırlayarsa, ata cəzanı davam etməməlidir. Əksinə uşağın nəfsində Allaha təzimdən ötrü cəzadan qaçmalıdır. Necə ki, xidmətçi Allahı xatırladıqda onu vurmaq qadağan olunmuşdur. Uşaq isə daha əfzəldir. Uşaq başqalarının önündə döyülməməlidir. Çətinə düşdüyü üçün uşaq əqrəbalarının da yanında döyülməməlidir.[34]

---

[34] Tərcüməçidən: Nəinki döyülmək hətta uşağa başqalarının yanında qəlbinə dəyəcək bir söz belə deyilməməlidir. Çünki bu psixolojik olaraq uşaqda

## 6. Uşağın bir dəfə namaz qılmadığını gördükdə necə davranmalıyıq?

Əhəmiyyət verilməsi lazım olan son nöqtə, uşağın izlənilməsi, qüsurlarının tədqiq edilməsi, xəta etdikdə rüsvay edilməsi və həya pərdəsinin götürülməsi məsələsidir. Bax bu nöqtədə böyük alim İmam Qazali uşağın gözəl işlər görməsi üçün dəstəklənməsi və buna görə mükafatlanırılması məsələsini qeyd etdikdən sonra belə deyir: "... Əgər bunlara bəzi hallarda bir dəfə müxalifət edərsə, buna əhəmiyyət verilməməli, həya pərdəsi götürülməməlidir... Xüsusilə uşaq bu xətasını örtər və gizləməyə çalışarsa, bunu uşağın əleyhinə açığa çıxarmaq, ümumiyyətlə ona cəsarət verər, hətta bunu açıq-aşkar işləməyə əhəmiyyət verməz bir hala gətirər. Ona görə də bu nöqtədə, əgər ikinci dəfə eyni xətanı işləyərsə, gizlincə cəzalandırılması lazımdır və bu barədə şərait daha böyük olmalıdır".

Bax bu, uşağa qarşı duyulan mülayimlik və mərhəmətin əsasıdır. Yoxsa hər xəta və xırda səhvə görə uşağa cəza vermək olmaz. Bu vəziyyət heyvanlarda belə qanuni ikən şəxsiyyətli insanda niyə görə qanuni olmasın? Rəvayət olunduğuna görə Aişə (r.a), möminlərin anası bir dəvəyə minmiş, dəvə ona qarşı

---

mənfi təsir yaradar, o özünü başqalarının yanında alçalmış kimi hiss edər. Bu da tərbiyəsinin pozlmasına yol açar. Nə edək biz daima bu təlim tərbiyədən uzaq qalmışıq, həmişə bizim heç bir sözümüz valideynlərimiz tərəfindən dəstəklənməyib. Bu gün də cəmiyyətimizdə uşaqlara qarşı münasibət aşağı səviyyədədir. Uşaq bir söz dedikdə ona: "Uşaqsan otur uşaq yerində" kimi sözlər deyilərərk uşağın sözü qəbul olunmur, eyni zamanda uşaq məclislərdə, ictimai yerlərdə təhqir olunur, bununla da uşağın həm tərbiyəsi pozulur, uşaq ruhi cəhətdən sarsıntı keçirir, inamsız, ümidsiz, qorxaq, cəsarətsiz, kölgəsindən belə qorxacaq vəziyyətinə gəlir. Bu da gələcəkdə uşağın hər cəhətdən zəifliyinə gətirib çıxarır. Hörmətli valideynlər gəlin Allah Təalanın bizə həm nemət olaraq, həm əmanət olaraq, həm də imtahan olaraq bəxş etdiyi övladlarımıza olan hörmətimizi, diqqətimizi və qayğımızı artıraq.

dəcəllik etmişdir. Aişə (r.a) belə deyir: "Bundan sonra onu danlamağa başladım. Rəsulullah (Allahın salamı və xeyir bərəkəti onun üzərinə olsun): "Mülayim davranmalısan" buyurdu".[35] Əgər müsəlman dəvəsinin üzərindəykən belə mülayim davranmaq əmr edilibsə, bəs övladına qarşı necə davranmalıdır?

Aləmlərin Rəbbi olan Allaha həmd olsun...

[35] Müslüm

# AYLIQ NAMAZ IZLƏMƏ CƏDVƏLI

| Tarix | Səhər namazı | Zöhr namazı | Əsr namazı | Məğrib namazı | İşa namazı | Qeydlər |
|---|---|---|---|---|---|---|
| 1 | | | | | | |
| 2 | | | | | | |
| 3 | | | | | | |
| 4 | | | | | | |
| 5 | | | | | | |
| 6 | | | | | | |
| 7 | | | | | | |
| 8 | | | | | | |
| 9 | | | | | | |
| 10 | | | | | | |
| 11 | | | | | | |
| 12 | | | | | | |
| 13 | | | | | | |
| 14 | | | | | | |
| 15 | | | | | | |
| 16 | | | | | | |
| 17 | | | | | | |
| 18 | | | | | | |
| 19 | | | | | | |
| 20 | | | | | | |
| 21 | | | | | | |
| 22 | | | | | | |
| 23 | | | | | | |
| 24 | | | | | | |
| 25 | | | | | | |
| 26 | | | | | | |
| 27 | | | | | | |

# Qaynaqlar

1. Məsuliyətul-Əbul-Müslim fi tərbiyətil vələd fi mərhələti-t-tifuləti, Adnan Hasan bin Haris, Darul Muctəma, Ciddə, tb. 4\1993.
2. Tərbiyətul ətfal fi rihabil-İslam fi beyti, Muhamməd Həmid Nasir, Havlə Abdulqadir Dərviş. Ciddə, tb. 1\1991.
3. Usulu-t-Tərbiyəti və əsalibuhə fil beyti vəl-mədrəsəti vəl-müctəma, Əbdürrahman Nəhləvi, Darul Fikr, Dəməşq, tb. 2\1983.
4. Əxlaqul İslamiyyə və əsasuhə, Əbdürrəhman əl-Meydani, Darul Qələm. Tb. 2\1987.
5. Cəvamiul ədəba fi əxlaqi-l əncab, Cəmaləddin əl-Qasimi, Daru İbn Kəsir, tb.1\1996.
6. İthaful-xeyratil mihrə fi mərifəti vəsailit tərbiyətil müəssirə, Ümmü Əbdürrəhman bint Əhməd əl-Cudr, tb.1\198
7. Məcəllətu Vələd; №2, Yanvar\1999, Küveyt.

